AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 70, №2, səh. 31-35 (2015)

# Quba Rayonu Ərazisinin Yabanı Dekorativ Ot Bitkilərinin Taksonomik Təhlili

**P.N. Ağayeva*, P.X. Qaraxani**

*AMEA Botanika İnstitutu, Badamdar şossesi, 40, Bakı AZ1004, Azərbaycan;*
**E-mail: apn_aghayeva@yahoo.com*

**Quba rayonunun yabanı ot bitkiləri sırasına dekorativ əhəmiyyətli bir çox növlər daxildir. Məqalədə rayon üzrə 2013-2014-cü illərdə toplanılmış 63 dekorativ ot bitkisi barədə məlumat verilir. Ot növlərini qruplaşdırmaq üçün yeni taksonomik yanaşma istifadə edilmişdir. *Campanula saxifraga* Bieb. subsp. *aucheri* (A.DC.) Ogan. taksonunun Quba üzrə yeni yayılma ərazisi müəyyən edilmişdir.**

***Açar sözlər:*** *Yabanı, bəzək, növ, takson, müxtəliflik*

## GİRİŞ

Dekorativ bitki növlərinin təyini və müasir üsullarla öyrənilməsi yeni elmi tədqiqat sahəsi kimi ətraf mühitin daha geniş spektrdə səmərəli idarə və istifadə edilməsi üçün böyük imkanlar açır. Gündəlik həyatımızda rast gəldiyimiz çiçəkli bitkilərin əksəriyyəti yabanı əcdadlarından törənmişdir. Təbiətin yabanı çiçəkli bitkilərdən ibarət sərvəti əbədi deyil, onların bir qismi zamanla məhv olmuş, bir qismi təbiətin insanlar tərəfindən amansız istismar edilməsi nəticəsində təhlükə altında olan və nadir bitkilərə çevrilmişdir. Bu baxımdan gələcəkdə sürətlə dəyişən mənzərənin etibarlı idarəedilməsi üçün yabanı bitkilərin, o cümlədən yabanı dekorativ bitkilərin vaxtında sənədləşdirilməsi mühüm əhəmiyyət kəsb edir.

Dekorativ bitkilər əhəmiyyətinə görə qida, yem, dərman və s. bitkilərdən sonra gəlir və buna görə də olduqca az tədqiq edilmişdir. Lakin dekorativ bitkilər, o cümlədən çiçəkli bitkilər insanların həyati tələbatlarını birbaşa təmin etməsələr də, estetik nöqteyi-nəzərdən böyük əhəmiyyətə malikdirlər. Bitkilərdən bəzək kimi istifadə edilməsinə bir çox xalqların inkişafının ilkin mərhələlərində təsadüf edilir. Məsələn, Çində Sya sülaləsinin (b.e.ə. 2070-1600) yabanı növlərdən dekorativ baxımdan istifadə etməsinə dair tarixi məlumatlar vardır (Wang and Zhang, 1993; Heywood 2003). Həmin dövürlərdə dekorativ bağçılığın inkişafının ilkin məqsədi bitkilərdən və məkandan istifadə edərək insanların həm funksional, həm də estetik inteqrasiyasını təşkil etmək idi. Hazırda kulturada istifadə edilən dekorativ bitkilər öz yabanı əcdadlarından seleksiya və çoxaltma yolu ilə əldə edilmişdir. Dövrümüzdə landşaft bitkiləri, ev bitkiləri və kəsilmiş çiçəklər sənayenin gəlirli sahələrindəndir və bu sahədə ABŞ, Çin, Niderland və Yaponiya kimi ölkələrin llik gəlirləri milyardlarla dollarla ölçülür (Heywood, 2003).

Azərbaycanda ot bitkilərinin bəzək məqsədilə istifadəsinə dair məlumatlar azdır və əsasən son iki əsrə aid edilə bilər. “Растительные ресурсы Кавказа” kitabında akademik A.A.Qrossheym tərəfindən dekorativ və yaşıllaşdırma məqsədilə istifadə edilən birkilər dekorativ xüsusiyyətlərinə görə qruplaşdırılmışdır (Гроссгейм, 1946). Azərbaycan florası (“Флора Азербайджана”, т. I-VIII) çoxcildliyində növlərin müxtəlif aspektlərdə, o cümlədən dekorativ baxımdan istifadə imkanlarına dair məlumatlara rast gəlinir. Ötən əsrin 60-cı illərində Böyük Qafqazın yabanı dekorativ bitkiləri geniş tədqiq edilmişdir (Тутаюк и др., 1961). Bununla yanaşı son illərdə fərqli istiqamətlərdə aparılan tədqiqat işlərində də dekorativ növlər barədə məlumatlar verilmişdir (Мехтиева, 2012, 2014).

Bəzək bitkiləri olmaqla yanaşı öyrənilən növlərin bəziləri sənayedə, tibdə, yemçilikdə istifadə edilir. Belə ki, ərazidə yayılmış növlərdən *Epipactis palustris* (L.) Crantz, *Equisetum arvense* L., *Ranunculus elegans* C. Koch dərman, yem, *E. Arvense* həm də boyaq bitkisi kimi əhəmiyyətə malikdir. Bu sırada tərkibində vitamin, qlükozid, efir yağları, kumarin, lakton, saponin və şəkərlər olan bir sıra bitkilər də yer alır (Sərkərov, 2005; Novruzov 2010).

Bütün yuxarıda deyilənlərə rəğmən, Quba rayonunun dekorativ florası demək olar ki, bütövlükdə işlənilməmişdir, görülən işlərin əksəriyyəti müəyyən taksonomik qrupları və ya təsərrüfat əhəmiyyətli bitkiləri əhatə edir. Rayonun yabanı bitki aləmi zəngin və məftunedicidir; çox sayda botaniki baxımdan maraqlı, iqtisadi əhəmiyyətli, nadir, təhlükə altında olan və endemik növləri əhatə edir. Yüksək dağlar, qaya silsilələri, dərələr, düzənliklərdən ibarət relyeflə səciyyələnən rayonun iqlimi və torpaq tərkibi də hündürlükdən asılı olaraq dəyişkəndir ki, bu da rəngarəng ekoloji müxtəlifliyin

formalaşmasına səbəb olur. Zamanla ərazi boyu dəyişən coğrafi şərait iqtisadi və genetik müxtəliflik baxımından bitkilərin əhəmiyyətli ehtiyatının toplanması ilə nəticələnmişdir.

Təqdim edilən iş rayon üzrə dekorativ otların növ tərkibini araşdırmağa, bəzək bitkilərinin sənədləşdirilməsi istiqamətində olan boşluqları nəzərə alaraq gələcəkdə aparılacaq tədqiqat işlərinin ümumi istiqamətinin müəyyənləşdirilməsinə xidmət edir.

## MATERIAL VƏ METODLAR

Quba rayonu 556 km$^2$ əraziyə malik olub, Azərbaycanın şimal-şərqində yerləşir. Rayon Böyük Qafqaz dağ silsiləsinin cənub-şərq yamacı boyu geometrik olaraq üçbucaq təşkil edir. Tədqiqatın materialları 2013-2014-cü illərdə yaz, yay və payız aylarında müxtəlif marşrutlar üzrə fərqli ekosistemlərdən ekstensiv və intensiv çöl işləri zamanı toplanmışdır. Bitkilərin bitmə yerləri çöl ekspedisiyaları zamanı müəyyən edilmişdir, nümunələrin GPS koordinatları götürülmüşdür. Əsas tədqiqat sahələri kimi Qrız Dəhnə (N41°13′678″ EO 48°18′737″), Qələdüz (N41°21.494′ EO 48°27.969′), Qəçrəş (N40°19′10″ EO048°23′99″), Cek (N41°22′409″ EO48°04′398″) və Təngəaltı (N41°13′27.50″ EO48°45′327.84″) kəndlərinin ərazisi seçilmişdir. Yerli ot bitkiləri çiçək, gövdə və yarpaq quruluşları nəzərə alınmaqla dekorativ baxımdan qiymətləndirilmişdir. Toplanılmış hər bir nümunənin xarakteristikası qeyd edilmiş, herbari nüsxəsi hazırlanmış, foto sənədləşməsi aparılmışdır. Növlərin təyinatı üçün məlum flora, konspekt və təyinedicilərdən istifadə edilmişdir (Əsgərov, 2005, 2006, 2008; Зернов, 2010; Конспект Флоры Кавказа, 2003, 2006, 2008; Флора Азербайджана, I том, 1950; II том, 1952; III том, 1953; IV том, 1953; V том, 1954; VI том, 1955; VII том, 1957; VIII том, 1961). Fəsilədən yuxarı taksalar üçün APG III (2009) və "Global Compositae Checklist" internet portalındakı məlumatlar nəzərə alınmışdır.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Quba rayonu üzrə bütövlükdə 135 bəzək bitkisi barədə məlumat vardır (Флора Азербайджана I-VIII) ki, bura 29 ağac, 30 kol, 4 kiçik ağac və kol, 72 ot növü aiddir. Tədqiqat zamanı bəzək əhəmiyyətli floristik müxtəliflik üzrə maraqlı nəticələr əldə edilmiş, ümumilikdə rayon üzrə toplanılmış yabanı ot bitkiləri 63 növ və növ daxili takson kimi təyin edilmişdir. Öyrənilmiş növlər müasir filogenetik tədqiqatların nəticələri nəzərə alınaraq qruplar üzrə analiz edilmişdir.

Pteridofitlər 1 fəsiləyə aid 1 növlə, Monocots 1 sıra, 2 fəsiləyə aid 4 növlə, Eudicots Rosids qrupunda yerləşən 1 sıra, 2 fəsiləyə aid 5 növlə, Coeudikots 5 qrupa (Fabids, Malvids, Asterids, Lamiids, Campanulids), 14 sıraya (1-i ranqsız olmaqla), 19 fəsiləyə aid 55 taksa ilə təmsil olunmuşdur (Cədvəl). Buradan göründüyü kimi qruplardan Campanulids 27, Lamiids 12, Fabids 8 növlə üstünlük təşkil edir. Digər qruplar 1-4 növlə qeyd edilmişdir.

Bitki növlərinin sıralar üzrə faizlə paylanmasına baxdıqda Asterales 35%, Lamiales 16%, Fabales 8%, Asparagales 6%, Ericales və Dipsacales sıralarının hər biri 5%, ranqsız (Unranked) da daxil olmaqla digər sıralar isə hər biri 2% təşkil edir (Şəkil).



**Şəkil. Bitki taksonlarının sıralar üzrə faizlə paylanması.**

Bitki növlərinin fəsilələr üzrə paylanmasına baxılmışdır (Cədvəl). Fəsilələrin əksəriyyətinə 1 və ya 2 növ aid edilmişdir. Fəsilələr arasında Asteraceae 20, Lamiaceae 7 növlə dominantlıq edir. Fabaceae 4, Papaveraceae və Adoxaceae fəsilələrinin hər biri 3 növlə təmsil olunur.

Təyin edilmiş növlərdən *Ajuga pseudochia*, *Cephalanthera damasonium*, *Consolida orientalis*, *Filipendula hexapetale*, *Lactuca serriola*, *Lythrum salicaria*, *Papaver commutatum*, *Tanacetum vulgare* növlərinin Azərbaycanda geniş yayılması müəyyən edilmişdir. Ədəbiyyat mənbələrinin və herbari nümunələrinin müqayisəsi əsasında müəyyən edilmişdir ki, *Calamintha debilis* (Bge.) Benth., *Crambe tatarica* Sebeók, *Crepis siberica* L. və *Dracocephalum austriacum* L. yalnız Böyük Qafqazın Quba massivində yayılmışdır.

*Campanula saxifraga* növünün Böyük Qafqaz botaniki rayonunda yayılması məlumdur (Əsgərov 2011), *Campanula saxifraga* Bieb. subsp. *aucheri*

**Cədvəl.** Quba rayonundan toplanılmış bəzəkli otların taksonomik müxtəlifliyi.

| Bitki qrupları | Sıra | Fəsilə | Cinslər və növ sayı |
|---|---|---|---|
| Pteridophyta Equisetopsida | Equisetales | Equisetaceae | *Equisetum arvense* L. |
| Monocots | Asparagales | §Asparagaceae | *Ornithogalum sigmoideum* Freyn & Sint. |
| | | Orchidaceae | *Anacamptis* pyramidalis (L.)Rich., *Cephalanthera* damasonium (Mill.) Druce, *Epipactis palustris* (L.) Crantz |
| Eudicots /Rosids | Ranunculales | §Papaveraceae | *Papaver* commutatum Fisch.& C.A.Mey., *P. fugax* Poir., *P. oreophilum* Rupr. (Syn.: *P. monanthum* Trautv.) |
| | | Ranunculaceae | *Consolida orientalis* J. Gay, *Ranunculus elegans* C. Koch |
| Core-eudikots/Fabids | Malpighiales | Violaceae | *Viola* alba subsp. scotophylla (Jord.) Myman (*V. alba* Bess.) |
| | Fabales | Fabaceae | *Astragalus lentiginosus* Dougl. ex Hook, *Galega orientalis* Lam., *Trifolium montanum* L., *T. trichocephalum* M.Bieb. |
| | | Polygalaceae | *Polygala anatolica* Boiss. & Heldr. |
| | Rosales | Rosaceae | *Filipendula hexapetale* Gibb. |
| | Myrtales | Lythraceae | *Lythrum salicaria* L. |
| Malvids | Brassicales | § Brassicaceae | *Crambe tatarica* Sebeók |
| | Caryphyllales | Caryophyllaceae | *Gypsophila elegans* Bieb. |
| Asterids | Ericales | Balsaminaceae | *Impatiens noli-tangere* L. |
| | | § Primulaceae | *Primula macrocalyx* (Bunge) Lüdi., *P. woronowii* Los.-Losinsk. |
| Lamiids | Unranked | §*Boraginaceae | *Echium russicum* J.F.Gmel |
| | Gentianales | Gentianaceae | *Gentiana cruciata* L. |
| | Lamiales | Lamiaceae | *Ajuga pseudochia* Des.-Schost. (Syn.: *A. glabra* C. Persl), *A. reptans* L., *Calamintha debilis* (Bge.) Benth., *Dracocephalum austriacum* L., *D. Ruyschiana* L., *Stachys byzantina* K. Koch. (Syn. *S. lanata* Jacq.), *Stachys macrantha* K.Koch. |
| | | Orabancheaceae | *Diphelypaea coccineae* (M. Bieb.) D.H.Nicolson, *Rhynchocorys elephas* (L.) Grisb |
| | | Scrophulariaceae | *Verbascum thapsiforme* Schard. |
| | Solonales | Convolvulaceae | *Calystegia silvatica* (Kit.) Griseb (Syn.: *C. silvestris* (Willd.) Roem. et Schult.) |
| Campanulids | Asterales | Asteraceae | *Aster alpinus* L., *A. ibericus* Steven, *Aster roseus* M.Bieb. ex Steven, *Bellis perennis* L., *Centaurea cheiranthifolia* Willd., *Crepis neglecta* L., *C. parviflora* Desf. ex Pers., *C. siberica* L., *Eupatorium cannabinum* L., *Inula orientalis* Lam, *Lapsana communis* L., *Lactuca serriola* L., *Leucanthemum vulgare* Lam, *Pojarkovia pojarkovae* (Schischk.) Greuter (Syn.: *Senecio pojarkovae* Schischk.), *Pyrethrum leptophyllum* Steven ex M. Bieb., *Senecio vernalis* Waldst. & Kit., *Symphyotrichum novae-angliae* (L.) G.L.Nesom (Syn.: *Aster roseus* Desf.), *Tanacetum vulgare* L. (Syn.: *Pyrethrum parthenifolium* Willd.), *Taraxacum officinale* F.H.Wigg, *Tragopogon graminifolius* DC. |
| | | §Campanulaceae | *Campanula saxifraga* subsp. *aucheri* (A.DC.) Ogan., *C. latifolia* L. |
| | Dipsacales | Adoxaceae | *Scabiosa columbaria* L., *S. bipinnata* K.Koch, *S. caucasica* M.Bieb. |
| | Apiales | Apiaceae | *Astrantia major* L. subsp. *Biebersteinii* (Trautv.) I. Grinţ, *Carum carvi* L. |

**Qeyd:** APG üzrə (§) - geniş mənada təmsil olunan fəsilələr, (*) - fəsilələrin yeni yerləşmələri.

(A.DC.) Ogan. taksonu qeyd edilən botaniki rayon (Quba) üçün ilk dəfə olaraq təqdim edilir (MAH1583). Taksonun Azərbaycanda Murovdağ və Gəncədə yayılmasına dair məlumatlar vardır. (Конспект Флоры Кавказа 2008, 3.1).

Rayon üzrə aşkar edilmiş növlərdən *Epipactis palustris* Qırmızı Kitabın II nəşrinə daxil edilmişdir (Qırmızı Kitab, 2013). Ümumiyyətlə, az rast gələn növlərin dekorativ əhəmiyyəti nəzərə alınaraq populyasiya səviyyəsində tədqiqi və uyğun mühit şəraitinə introduksiya edilmə imkanlarının araşdırılması məsələləri maraq doğurur.

Bununla yanaşı ərazidə kiçik fraqmentlərlə təsadüf edilən *Eupatoria cannabium* və *Verbascum thapsiforme* növlərinin populyasiyaları tərəfimizdən tədqiq edilmişdir (Агаева, Османова, 2013, 2014).

**YEKUN**

Bitki aləminin müxtəlifliyi respublika üzrə bir çox tədqiqatçılar tərəfindən öyrənilmiş və hazırda da tədqiq edilməkdədir. Yabanı floranı sənədləşdirməkdə bizim məqsədimiz onun dekorativ faydasını, istifadə imkanlarını araşdırmaq olmuşdur. Dekorativ effektə malik bitkilər A.A.Qrossheymin bölgüsünə əsasən beş sinfə ayrılmış və ot bitkiləri növ sayına və müxtəlifliyinə görə ən böyük sinfi təşkil edir (Гроссгейм 1946). O, həmçinin ot bitkilərini çoxillik, tez çiçəkləyən birilliklər (efemerlər), soğanaqlı və ya kökyumrulu, çim əmələ gətirənlər, qayalıq bitkiləri və su bitkiləri olmaqla qruplaşdırmışdır. "Флора Азербайджана" çoxcildliyində Quba rayonu üzrə göstərilən dekorativ ot bitkilərindən yalnız *Anacamptis pyramidalis*, *Bellis perennis*, *Calystegia silvatica*, *Impatiens noli-tangere*, *Primula macrocalyx* və *Stachys byzantina* dekorativ növ kimi qeyd edilir. Halbuki, digər növlər də xarici görünüş baxımından dekorativ olaraq qiymətləndirilə bilər. Bu növlərdən bəziləri mənzərə bağçılığında istifadə potensialına malikdir.

Bir çox gətirilmə bitkilər yalnız ekzotik olduqlarına görə mühit şəraiti uyğun olmadığı halda belə çoxaldılırlar və bu da bəzən gözlənilən nəticələr vermir. Bitki zəif inkişaf edir, ona gözəllik və ya qeyri-adilik verən əlamətlərini itirir. Halbuki yerli flora daha zəngin və füsunkardır. Lakin yerli dekorativ floranın istifadəsi dəqiq və ətraflı şəkildə təşkil edilmiş elmi tədqiqat işlərinə əsaslanmalıdır. Belə ki, mənzərə bağçılığı və bioestetik planlaşdırmanın qayəsini insan məskənlərinə eko-dost münasibətin formalaşması təşkil edir. Biz yabanı dekorativ bitkilərin tədqiqini, toplanmasını və qorunmasını bütövlükdə yabanı növlərin saxlanılmasının alternativ metodlarından biri kimi təklif edirik.

**MİNNƏTDARLIQ**

Müəlliflər Botanika İnstitutunun Ali bitkilərin sistematikası şöbəsinin əməkdaşlarından b.ü.f.d. Arzu Hüseynova və k.e.i. Şəhla Mirzəyevaya göstərilmiş köməkliyə görə təşəkkürlərini bildirirlər.

**ƏDƏBİYYAT**

**Azərbaycan Respublikasının Qırmızı Kitabı** (2013) Nadir və nəsli kəsilməkdə olan bitki və göbələk növləri. İkinçi nəsr. Bakı: 676 c., s.108.

**Əsgərov A.** Azərbaycanın alı bitkiləri. Azərbaycan florasının konspekti. Bakı: Elm, I c., 2005, 247 s.; II c., 2006, 283 s.; III c., 2008, 240 s.

**Агаева П.Н., Османова Г.О.** (2013) Онтогенетическая структура ценопопуляций посконника конопляного (*Eupatoria cannabium* L.). *V Межд. науч. конф. Популяционное биоразнообразие и устойчивость популяций, принципы и способы сохранения биоразнообразия.* Йошкар-Ола: 2012, **часть I:** 221-224.

**Агаева П.Н., Османова Г.О.** (2014) Онтогенетическая структура ценопопуляции коровяка скипетровидного (*Verbascum thapsiforme* Schrad.) в условиях Азербайджана. *Сборник науч. трудов по материалам Международной научно-практич. конференции: Актуальные проблемы развития науки и образования.* Москва: АР-Консалт, **часть 1:** 67-69 (РИНЦ).

**Гроссгейм А.А.** (1946) Растительные ресурсы Кавказа. Баку: АН Азерб. ССР, 671 с.

**Зернов А.С.** (2010) Растения Российского Западного Кавказа. Полевой атлас. Москва: Товарищество научных изданий КМК, 448 с., с. 156, 417.

**Конспект флоры Кавказа.** Ответственный редактор А.Л.Тахтаджян. Изд.-во Санкт-Петербургского университета. I том, 2003, 202 с.; II том, 2006, 466 с.; Товарищество научных изданий КМК, III (1) том, 2008, 469 с.; III (2) том, 2012, 623 с.

**Мехтиева Н.П.** (2012) Результаты ресурсоведческих исследований лекарственных растений флоры Азербайджана. *Известия (биологические и медицинские науки),* **67 (№1):** 30-38.

**Мехтиева Н.П.** (2014) Дополнение к флоре Азербайджана. *Труды Института Ботаники НАНА,* **XXXIV:** 137-140.

**Новрузов Е.Н.** (2010) Пигменты репродуктивных органов растений и их значение. Баку: Элм, 308 с.

**Серкеров С.**В. (2005) Терпеноиды и фенолпроизводные растений семейств *Asteraceae* и *Apiaceae*. Баку: CBS Polygraphic production. 312 с.

**Тутаюк В.Х., Гаджиев В.Д., Вагабов З.В.** (1961) Дикорастущие декаративные растений в горах Большого Кавказа. *Известия АН Азерб.ССР, сер.биол. и медиц.наук,* **№8:** 3-13.

**Флора Азербайджана.** Баку: АН Азерб. ССР. I т., 1950, 369 с.; II т., 1952, 317 с.; III т., 1952, 407 с.; IV т., 1953, 401 с.; V т., 1954, 578 с.; VI т., 1955, 539 с.; VII т., 1957, 646 с.; VIII т., 1961, 688с.

**Angiosperm Phylogeny Group** (2009) An update of the Angiosperm Phylogeny Group classification for the orders and families of flowering plants: APG III. *Botanical Journal of the Linnean Society,* **161(2):** 105-121.

**Heywood V.** (2003) Conservation and sustainable use of wild species as sources of new ornamentals. In proceedings IS on sustainable use of plant biodiversity. *Acta Horticulture,* **598:** 43-53.

**Wang D-J., Zhang L-Q.** (1993) A brief history of ornamental plants in ancient China. *Proceedings of the XI International Association of Botanic Gardens Conference,* Beijing, Wuxi: China Agriculture Press, p. 204-209.

## Таксономический Анализ Дикорастущих Декоративных Трав Территорий Губинского Района

**Р.Н.Агаева, Р.Х. Гарахани**

[1]*Институт ботаники НАНА*

К числу дикорастущих травянистых растений Губинского района Азербайджана относится большое количество декоративных видов. В статье представлены сведения о 63 видах декоративных трав, собранных и исследованных с использованием новых таксономических подходов на территории района в 2013-2014 гг. Было установлено новое место распространения для *Campanula saxifraga* Bieb. *subsp. aucheri* (A.DC.) Ogan. в Губинском районе.

***Ключевые слова:*** *Дикорастущий, декоративный, вид, таксон, разнообразие*

## Taxonomic Examination of Wild Ornamental Grasses of Guba Region

**P.N. Aghayeva, P.X. Garakhani**

*Institite of Botany, ANAS*

The wild grasses occurring in Guba region of Azerbaijan include considerable quantity of ornamental species. The article represents data on 63 ornamental grass species collected and investigated by using new taxonomic approaches in the region during 2013-2014 years. New distribution pattern of *Campanula saxifraga* Bieb. *subsp. aucheri* (A.DC.) Ogan. in Guba district was registered.

***Key words:*** *Wild, decorative, species, taxon, diversity*